**UOT: 336.714**

# BİRBAŞA XARİCİ İNVESTİSİYALARIN TƏŞVİQİ VƏ ONUN TƏNZİMLƏNMƏSİ MEXANİZMLƏRİ

**M. S. TALIBLI**
**Azərbaycan Dövlət İqtisad Universiteti (UNEC)**

*Birbaşa xarici investisiyaların ölkələr üçün üstün tərəfləri, həmin axına təsir edən amillər, bir neçə xarici ölkə timsalında xarici təcrübələr və onun məhdudlaşması ilə bağlı problemlər ümumi konteksdə baxılmışdır. Azərbaycanda birbaşa xarici investisiyaların mövcud durumu, onun tənzimlənməsi mexanimzləri və bu istiqamətli fəaliyyətin effektivliyinin artırılması yolları araşdırılmışdır.*

***Açar sözlər:*** *Birbaşa xarici investisiya, investisiya layihələri, xarici iqtisadi inteqrasiya, dövlət investisiyaları, xarici yardım mexanizmi, xarici impulslar*

İnvestisiyanın cəlbi heç bir ölkə üçün məqsəd olaraq deyil, vasitə olaraq dərk olunmalıdır. Əks halda investisiyanın əldə olunması avtomatik olaraq iqtisadi inkişafın özü olaraq qəbul olunacaq. Halbuki, iqtisadi inkişafla iqtisadi artımının məna yükünü eyniləşdirmək nəzəri olaraq böyük yalnışlıq olardı. Çünki, investisiya iqtisadi artıma təsir edən əsas amillərdən biri olduğuna görə dövlətin investisiya siyasəti məqsədyönlü olmalıdır, yəni mülkiyyət formasından asılı olmayaraq, investisiyanın istiqaməti əvvəlcədən iqtisadi sektorlar və regionlar üzrə dövlət tərəfindən müəyyən edilməlidir. Bu zaman sektorların və regionaların xərclədiklərindən daha çox, yığıma yönəlik fəaliyyətinə diqqət yetirmək lazımdır. Məşhur iqtisadçı S.C.Mill “Kapitalın artımı qanunu” əsərində yazır: “Bütün kapital yığımı bu gün gələcək naminə istehlakdan imtinanın məhsuludur. Kapitalın artması yığıma meyl edən qüvvələrdən asılıdır...yığıma həqiqi cəhd edən qüvvə həm də ictimai quruluşun və sivilasiyanın ümumi vəziyyətinə uyğun olaraq dəyişkəndir.” Bu dəyişkənlik çox zaman xarici və daxili, birbaşa və portfel investisiyalardan fərqləndirilməlidir. Biz bu elmi məqalədə birbaşa xarici investisiyaların təsirlərini təhlil etməyə və onlar üzərində fokuslanmağa çalışacağıq. Birbaşa investisiyalar - (kapital qoyana) investisiya qoyulan müəssisə üzərində nəzarət etmək hüququ verir və uzunmüddətli məqsədlər üçün nəzərdə tutulur. Birbaşa investisiya - dar mənada pul vəsaitinin əsas kapitala və material-istehsal ehtiyyatlarının artırılmasına qoyulmasıdır. Bu mənada göstərilən anlayış iqtisadi təhlildə, xüsusən BMT-nin milli hesablarında istifadə edilir.

Birbaşa xarici investisiyalardan danışmamaışdan öncə xarici investisiyaların mənbələrini dəqiqləşdirməyə ehtiyac var:

- Xarici dövlətlərin büdcə vəsaitləri;
- Xarici hüquqi və fiziki şəxslərin vəsaitləri;
- Beynəlxalq təşkilatların (humanitar, sosial – təminat və s.) maliyyə vəsaitləri;
- Dövlətlərarası kreditlər, qrant və texniki yardımlar;
- Beynəlxalq maliyyə institutlarının maliyyə vəsaitləri (kreditlər, qrantlar).

Məhz bu maliyyə mənbələri hesabına iqtisadiyyatın simasını ciddi sürətdə dəyişəcək korreksiyalar etmək mümkündür.

İnvestisiya maliyyə vasitələrinin genişlətmə, yeniləmə və modernləşdirmə məqsədilə istifadə edilməsidir [1]. Bu konfiqurasiya elə formada yaradılmalıdır ki, birbaşa xarici investisiya üçün həmin ölkədə normal investisiya mühiti olsun. O zaman birbaşa xarici investiisyalar həmin ölkədən qaçmaz, onun cazibə dairəsində özünə yar tapar. Bunun üçün nəzərə alınacaq bir neçə amilə ciddi diqqət yetirməmiz lazımdır.

### Birbaşa xarici kapitalın axınına təsir edən amillər

Birbaşa xarici kapitalla bağlı investisiya siyasəti indi demək olar ki, dünyanın çoxlu ölkələri can atır. İqisadi Əməkdaşlıq və İnkişaf Təşkilatına (Orqanization for Ekonomic Cooperation and Development- OEC) görə xarici kapital xarici ölkələrdə əldə edilən və ya yaradılan bina, ərazi, fabrik, istehsal təsisi, makina-təchizat kimi maddi dəyərlərə isə, birbaşa (dolayısız) xarici kapital investisiyaları birbaşa xarici kapital (BXK) deyilir. Bunllardan birinə görə, birbaşa xarici investisiyalar (foreing direct investments FDİ) qlobal istehsalın səbəb olduğu maliyyə axımlardır. Ümumilikdə, birbaşa xarici kapital daxilolmalarına təsir edən çoxlu sayda faktor göstərilir. Amma onlardan daha vacibləri aşağıdakılar hesab olunur [2]:

İqtisadi faktorlar. Xarici kapitalın gedəcəyi ölkədə axtardığı ən önəmli iqtisadi faktor bazarın böyüklüyüdür. Bu böyüklük sadəcə ev sahibi ölkənin

əhalisi ilə əlaqədar olmayıb, eyni zamanda effektiv tələbi ilə də bağlıdır.

Eyni zamanda, xarici investor gedəcəyi ölkədə investisiya endirimi, gömrük vergilərindən azad olma və ya ödənişləri zamana ucuz kredit və s. kimi vergi və pul təşviq tədbirlərindən yararlanmaq istəyə bilməkdədir. Bu təşviqlərin bol və müxtəlif olması xarici kapital üçün önəmlidir.

Xarici kapitalı cəzb edici başqa bir ünsür də, istehsal faktorlarının bol və ucuz olmasıdır. Fəqət istehsal faktorlarının kəmiyyət xüsusiyyətləri qədər, keyfiyyət xüsusiyyətləri də önəm daşımaqdadır.

Xarici investor firmalar eyni zamanda, investisiya qoyacaqları ölkələrin iqtisadiyyatlarının xaricə açıqlığı, dünya bazarları ilə inteqrasiya səviyyəsi, sərbəst bazar iqtisadiyyatının tətbiq edilib-edilmədiyi və əgər edilirsə nə ölçüdə riayət edildiyi, hüquq və ədalət sisteminin müasirliyi kimi faktorları diqqətə almaqdadırlar.

Siyasi faktorlar. Birbaşa xarici kapital investorunun ən çox diqqət etdiyi mövzu investisiya qoyacağı ölkənin iqtisadi və siyasi stabilliyə sahib olmasıdır. Qlobal şirkətlər, ümumi olaraq, bir dövlətin siyasi vəziyyətinin investisiya qərarlarına təsir göstərdiyini söyləyirlər. Bir çox durumda şirkətlər qeyri-stabil siyasi şəraitə sahib olan ölkələrdə investisiya və ya təkrar investisiya (re-investment) qoymaqdan çəkinirlər.

Sosial və psixoloji faktorlar. İdeoloji cərəyanların xarici kapital haqqındakı neqativ kompaniyaları da xarici kapitalı narahat edən məsələlər sırasındadır. Bu şirkətlər investisiya qoyacaqları ölkələrdə xalqın reaksiyasından qorxduqları üçün bəzi layihələrində tərəddüd edərək portfellərini azaltmış və ya oranı tərk etmişlərdir.

Əxlaqi və mənəvi dəyərlər. Ölkənin sahib olduğu sosial quruluş, ənənəvi xüsusiyyətlər, əxlaqi və mənəvi dəyərlərin xarici kapital investisiyalarına neqativ təsir göstərməməsi lazımdır. Iqtisadi nəzəriyyədə əxlaqi dəyərlərin investisiya qərarlarına təsir göstərməməsi, iqtisadi rasionallığın həlledici olması lazımlığı bildirilsə də, praktikada xarici investorların özlərini əcnəbi hiss etməyəcəkləri bir şəraitdə çalışmaq istəməyi tərcih etdiklərini söyləyirlər. Qısacası, ticari düşüncələr və rentabellik ilk və öncəlikli tərcih səbəbi olmaqla bərabər, sosial və əxlaqi dəyərlərdəki fərqliliklərin xarici investisiya qərarlarına təsir göstərdiyini düşünə bilərik. Digər çox önəmli amillərlə bərabər, Qərbi Avropa və Amerika mənşəli kapitalın daha çox öz aralarında investisiya yatırmalarının bir səbəbi də bu faktordur.

Yuxarıda sadalanan amilləri nəzərə alaraq birbaşa xarici investisiyaya nə qədər açıq olmaqları ilə bərabər, eyni zamanda daxili bazarlarını da xarici investorlar tərəfindən ekspansiya edilməsi ilə də razı ola bilməzlər. Tamam əks mövqe hesab olunan bir siyasət-proteksionizmi də təşviq edən addımlar da birbaşa investisiyaların gəlişinə təsirsiz ötüşmür.

Hər hansı bir milli bazarı idxallardan qoruyan tariflər birbaşa investisiyaları stimullaşdırır [3].

**Birbaşa xarici investisisiyaların ölkə üçün pozitiv effektləri**

Təbii ki, birbaşa xarici investisiyaların ölkə üçün müsbət qeyd edilə biləcək tərəfləri də vardır. Onları lakonik olaraq belə qruplaşdırmaq olar:

- Ölkənin milli gəlir səviyyəsini artıraraq iqtisadi inkişafı təmin edər.
- Məşğulluq səviyyəsini artıraraq işsizliyin azalmasına yardım edir.
- Qabaqcıl istehsal bilgisi (know-how) və texnologiyalarını və idarəetmə (menecment) texnikalarının tətbiqini mümkün edir.
- Uzun dönəmdə idxalatı əvəz edici və ixracatı artırıcı, effektlər yaradaraq, ölkənin tədiyyə balansının düzəlməsinə yardım edir.
- Ölkə iqtisadiyyatına canlılıq və dinamizm qazandırır, daxili rəqabəti artırır.
- Maliyyə qaynaqlarını və investisiyaları artırır, fondların qaynağını çeşidləndirərək stabilliyə müsbət təsir göstərir. Bu da ölkənin xarici borc ehtiyacını azaldır.
- Ölkəyə vergi gəliri qazandırır.

Birbaşa xarici investisiyalar ev sahibi ölkənin xarici iqtisadi inteqrasiyasının təmin edilməsinə müsbət təsir göstərir, xarixə qapalı cəmiyyət olmaqdan qurtarır.

**İnvestisiya layihələri yoxsulluğun azaldılması indikatoru kimi**

İnvestisiya layihələri özlüyündə iqtisadi məzmun kəsb etməsinə baxmayaraq sosial təsirləri ilə daha çox yaddaşlarda qalır. Əslində layihələrinin təsirlərinin qiymətləndirməsi zamanı sosial aspekt daha çox diqqəti çəkir. Bu mənada sosial infrastruktur elementlərinə təsirlərin önəmi olduqca böyükdür.

Xarici yardım mexanizmi illər öncə insanların küllü miqdarda investisiya aclığı və yoxsulluğun aradan qaldırmaq üçün kifayət qədər iqtisadi aktivlik yarada biləcəyini düşünən vaxtlarda yaradılmışdır. Lakin, nə donorlar, nə də alıcılar həqiqətən də yoxsulların necə yaşadığından narahat deyillər. Donor yardımın məqsədi təşkilat quruculuğu, köhnəlmiş təşkilatların əvəzlənməsi, insanların öz problemlərini həll etmələri üçün bir araya gətirilməsi üçün deyil, diqqəti cəlb edən fiziki strukturlar – körpülər, nəhəng pristijli zavodlar, sədlərdir [4].

Bu mənada biz beynəlxalq maliyyə qurumların alınan kreditlərin əsasən infrastruktur layihələrinə sərf etməli yox, onun geriyə dönüşünü təmin edən obyektlərə yönəltməli və bir neçə amili nəzərə almalıyıq.

İnvestisiya layihələri qiymətləndirilərkən, meyar kimi enerjiyə qənaət, ətraf mühitin qorunması, mənfəətlilik göstəriciləri rəhbər tutulmalıdır [5].

**Azərbaycanda birbaşa xarici investisiyaların cəlbi perspektivləri**

Araşdırmalar göstərir ki, xarici investorlar neft-qaz istehsalı ilə yanaşı mövcud sənaye müəssisələrini almaq, onu yenidən bazar münasibətlərinə uyğun qurmaq əvəzinə yeni müəssisələrin tikilməsinə üstünlük verirlər. Düzdür qeyri-neft sektoruna xarici investisiyaların artmasına hələ daha çox ehtiyac var. Baxmayaraq ki, ölkə iqtisadiyyatına toplam halda investisiya qoyluşları 100 milyar dolları ötmüşdür.

Azərbaycanın İqtisadiyyat və Sənaye naziri Şahin Mustafayev Bakıda keçirilən Azərbaycan-Səudiyyə Ərəbistanı biznes forumundan çıxışı zamanı söyləmişdi ki, ölkə iqtisadiyyatına yatırılan investisiyaların ümumi həcmi 156 milyard dolları ötür. Yatırılan sərmayələrin təxminən yarısı xarici ölkələrin payına düşür [6].

Xarici mənbələr hesabına təmin olunan layihələrin özü də daha çox istehsal təyinatlı olmaqla idxal asıllığının qarşısını almağa xidmət edən və milli istehsalın genişlənməsinə nail olmağı hədəfləməlidir. Bu zaman milli istehsal genişlənməklə təkrar istehsal üçün zəmin yaradır və sahibkarları daha çox reinvestisiya meylini gücləndirmiş olur.

İnvestisiyalar müxtəlif şəkildə ola bilər. Fabriki böyütmək, elmi-tədqiqatlar aparmaq, yeni məhsullar hazırlamaq. Lakin bütün bu investisiyalar istehsalın artmasına kömək etməli və daha böyük gəlir gətirməlidir. Yeni kapitalis əqidəsinə ilk və ən müqddəd əmr budur: "İstehsaldan əldə olunan gəlir istehsalın artırılmasına yönəldilməlidir." Buna görə də kapitalizmin adı "kapitalizm"dir. Kapitalizm "kapital"ı, yəni sərmayəni "zənginlik"dən fərqləndirir. Sərmayə-istehsala qoyulmuş pul, mal və qaynaqlar deməkdir. Zənginlik ya torpağa basdırılır, ya da məhsuldar və faydalı olmayan işlərə xərclənir [7].

## Nəticə

1. İldən-ilə neft sektoruna azalan xarici investisiyaların tendensiyanı nəzərə alaraq qeyri-neft sektorunda xarici investisiyanın cəlbi üçün normal investisiya mühitinin formalaşdırılması, xüsusilə xalq istehlakı malları istehsal edən sahələrin, kənd təsərrüfatını maddi-texniki bazasını möhkəmləndirməyə və onu inkişaf etdirməyə ehtiyac duyulur.

2. Birbaşa investisiya axınına təsir edən amilləri bütöv sistem halında təhlil etmək və həmin struktura ciddi nəzarəti daim olaraq gündəmdə saxlamaq vacibdir. Siyasi dalğalanmalar, iqtisadi rejimin stabil platformada qalmasını, sosial indikatorların yaxşılaşmasını, korrupsiya risklərinin azaldılmasını, inhisarçılıq meyllərinin aradan qaldırılmasını təmin edən effektiv komplek tədbirləri həyata keçirmək.

3. Birbaşa xarici investisiyaların ölkə üçün müsbət təsirlərini göz önünə gətirərək makroiqtisadi göstəricilərin (ÜDM, ÜMM, milli sərvət, dövlət büdcəsi balansı, xarici ticarət dövriyyəsi, məşğulluq və s.) yaxşılaşmasını təmin edən fəaliyyətlərin effektivliyini təmin etmək.

4. Birbaşa xarici investisiyaların Azərbaycan iqtisadiyyatına axınını təmin etməklə, daha çox sosial infrastruktur elementlərini effektiv etməklə, sosial təyinatlı sahələrin, o cümlədən yoxsulluğun azaldılmasına xidmət edən layihələrin reallaşdırılmasına birbaşa və dolayı dəstək mexanizmlərindən istifadə etməyi prioritet elan etmək lazımdır.

5. Dövlət investisiyaları və xarici investisiyalar arasında optimal həddin tapılmasına və bu istiqamətdə dövlətin fiskal və monetar stimullarının artırılmasına nail olmaq gərəkdir. Xüsusilə qeyri-neft sektoruna xarici investiisyalarının artıırlması hesabına qeyri-neft ixracat potensialını genişləndirmək.

### ƏDƏBİYYAT

**1.** Tevfik Tatar, "Yatırımların seçimi ve değerlendirme texnikleri, Qazi Universiteti Yayın No 182, Ankara-1993, səh.3. **2.** Natiq Sabiroğlu, Qloballaşma və xarici investisiyalar, Bakı-2006, səh.49. **3.** Richard E. Caves : "Transmilli müəssisə və iqtisadi təhlil", Kembric İqtisadi Ədəbiyyat Nəşrləri, Bakı-2005, səh. 39. **4.** Muhammad Yunus (Nobel): "Kasıbların bankiri", Bakı-2016, səh. 19. **5.** Tofiq Hüseynov: "Azərbaycanda bazar sisteminin iqtisadi problemləri", Bakı-2004, səh.125. **6.** Banker.az/azərbaycan-iqtisadiyyatina-yatirilan-sərmayənin-həcmi-aciqlandi/ 2014. **7.** Yuval Noah Harari: "Sapiens: Bəşəriyyətin Qısa Tarixi" , Bakı-2017, səh. 346

### Механизмы регулирования прямых иностранных инвестиций и ее поощрения

**М. С. Талыблы**

В этой статье рассмотрены приоритетные стороны прямых иностранных инвестиций и факторы влияющие на эти стечения, а также проблемы, связанные с ограничениями на примере опыта некоторых зарубежных стран. Также рассмотрены нынешнее состояние и механизмы регулирования прямых иностранных инвестиций в Азербайджане и .исследованы пути повышения эффективной деятельности в этих направлениях.

***Ключевые слова:*** Прямые иностранные инвестиции, инвестиционные проекты, иностранные экономические интеграции, государственные инвестиции, механизм иностранной помощи, внешние импульсы.

### Encouragement of Foreign Direct Investments and its regulatory mechanism

**M. S. Talibli**

This study analysis advantages of Foreign Direct Investments for countries, experience of several foreign countries, and impact factors and limitation problems of this process in general context. The study also investigates current status of FDIs, management mechanisms and possible methods to increase effectiveness of FDIs in Azerbaijan.

***Key words:*** Foreign direct investment, investment projects, foreign economic integration, funds, foreign aid mechanisms, foreign impulses.